# İÇİNDƏKİLƏR

# TƏQDİMAT



**PROFESSOR MUSA YILDIZ**
*Əhməd Yasəvi Universiteti Himayəçilik Şurasının Sədri*



*Həzrəti Türküstanın Piri Əhməd Yasəvi böyük əxlaq, eşq və irfan adamıdır, Allah dostudur. Türk mədəniyyət tariximizin ən mühüm şəxsiyyətlərindən biridir. O, təkcə Arslan Babın, Yusif Həmədani Həzrətlərinin könlündə yandırdığı İslamın eşq və ürfan qığılcımını özündən sonrakı davamçılara ötürməmiş, eyni zamanda da yetişdirdiyi hərəkatçı Alpərənləri Asiyanın bir ucundan Avropanın içlərinə qədər göndərərək insanlara ədalət, təvazökarlıq, birlik və dirlik fikrini aşılamışdır.*

*Yasəvi Həzrətləri, dövrünün din və mədəniyyət dili olan ərəb və fars dili əvəzinə, ana dili olan türk dilindən istifadə etmiş, türk dilini elm, eşq və ürfan dilinə çevirmişdir. Söhbətlərində və nitq yolu ilə ifadə etdiyi hikmətlərində ana dili olan türk dilindən istifadə edərək geniş kütlələrə təsir göstərən ilk türk mütəsəvvüfü olmuşdur. Bu gün geniş bir coğrafiyada danışılan və yazılan türk dilindən bəhs ediriksə, bunu təmin edən Ulu Pir Əhməd Yasəvidir.*

*Digər tərəfdən Əhməd Yasəvi Həzrətləri, öz dövründə İslamın əsas xəttindən kənarlaşan və ümumi şəkildə rafizilik, zındıqlıq və mülhidlik kimi qiymətləndirilən qeyri-sünni axın və yollara qarşı Quran və Sünnət bayrağını qaldıran insandır. O, Quranın təqdim etdiyi, Həzrəti Peyğəmbərin*

*tətbiq və təlqin etdiyi səhih İslamı xalqa anladan məna insanı, Quranın eşq və ürfan ölçülərinin şərhçisidir.*

*Belə ki, Əhməd Yəsəvi dedikdə biz, Həzrəti Peyğəmbərin yaşadığı İslamı, bu İslamı ana dili ilə, hər kəsin anlayacağı türk dili ilə anladan ilk türk mütəsəvvüfünü və yetişdirdiyi hərəkatçı Alpərənlərlə İslamın tövhid və ədalət nurunu cahana yaymaq üçün çalışan bir grup sərdənkeçdiləri xatırlayırıq.*

*Həzrəti Türküstan, verdiyi mesajları ilə təkcə bizim millətimizin deyil, həm də universal dəyərdir. Onun adına yazılan Yasəvilikyolu, əsas etibarilə İslamın türk dilində şərhindən başqa bir şey deyildir. Allah, Peyğəmbər və varlıq sevgisini könüldə toplayan bu abidə şəxsiyyət, eşq və ürfanın, səmimiyyətin, dözümlülüyün, insana hörmət və sevginin, dərinləşmə və genişlənmənin simvoludur.*

*Bir mənzumədə Türküstanın qəbi belə ifadə edilir:*

*Türküstanın qəlbi Əhməd Yasəvi*
*Eşq ilə  yoğurmuş bütün könülləri*
*Toplamış başına Alpərənləri*
*Demiş igidlərə ərlik yolu bu*
*Ərənlər həqiqi yarlıq yolu bu*

*Məlamət sirrini Arsalan Babadan*
*Alıb fəqir donunu geymiş əbadan*
*Vermiş icazəni Yusif Həmədan*
*Demiş nəticədə gurluq yolu bu*
*Nəfsini bilənin hürlük yolu bu*

*Bu yaşıl qübbədə səs buraxan Pir*

*Hikmətli sözlərlə anladıb bir-bir*

*Vəhyin dili ilə türkcə səslənir*

*Deyir Türküstana birlik yolu bu,*

*Aman dağılmayın dirlik yolu bu...*

*Təkbir səsləri ilə sulanan bozqır*

*Ruzigara qarışıb "Hu" sədalanır*

*Yasəvi türbədən nurla parlayır*

*Deyir, türk qarındaş! Birlik yolu bu*

*Ayrılma Qurandan dirlik yolu bu*

*(Mustafa Tatcı)*

*Bü gün Yasəvinin qurduğu dünyanı biz onun yandırdığı çıraqdan alacağımız yeni qığılcımlarla dünyaya daşımalıyıq. Bu baxımdan əlinizdəki əsər, bu missiyanın bir göstəricisidir.*

*Əsərin hazırlanmasında əməyi olan professor Necdət Tosuna, hikmətlərin türk dilinə mənzum formada tərcüməsini / uyğunlaşdırılmasını həyata keçirən Musa Uzunqayaya, sadələşdirməyə nəzarət edən professor Zülfiqar Güngörə və əməyi olan hər kəsə universitetim adından təşəkkür edirəm.*

# ÖN SÖZ



**PROFESSOR NECDET TOSUN**



*XII əsində mühüm xidmətləri olmuş, həmçinin də söylədiyi hikmət tərzli şerləri ilə türk dili və ədəbiyyatına mühüm töhfələr vermiş bir alim, mütəsəvvüf və şairdir. Haqqında dildən-dilə dolaşan rəvayətlər və ona istinad edilən bir neçə risalədən başqa onun fikirlərini və duyğu dünyasını bizə çatdırn ən mühüm əsərlər, şerlərinin toplandığı "Divan-i Hikmət"lə tələbəsi və müridi Sufi Məhəmməd Danışməndinin qələmə aldığı "Miratül-Kulub" adlı əsərdir.*

*"Divan-i Hikmət"in əlyazma nüsxələrindəki şer saylarının bir-birindən fərqli olması və əski tarixli əlyazmalarının tapılmaması səbəbindən bu əsərin əvvəlcə dildən-dilə ötürüldüyü, sonralar qələmə alınarkən fərqli formalarda yığıldığı və hətta başqa şairlərə aid şerlərin də bu məcmuələrə qarışmış ola biləcəyi ehtimal edilir. Bununla yanaşı "Divan-i Hikmət"dəki bütün şerlər, Xoca Əhməd Yasəvinin dini, əxlaqi və mistik firkirlərini əks etdirəcək xarakterdədir.*

*Yasəvinin könül dünyasını bizə çatdıran bu şerlər, Şərq türkcəsinin yazı dili ənənəsi çərçivəsində, Cığatay türkcəsi ilə qələmə alındığı üçün müasir dövrümüzdə elə də rahat anlaşılmır. Bu şerlərin həm çağdaş türk ləhçələrinə, həm də ingilis və rus dili kimi dünyada geniş istifadə edilən dillərə tərcümə edilərək insanlığın istifadəsinə verilməsi mühüm bir ehtiyac idi. Bu ehtiyacı qismən də olsa qarşılamaq üçün "Divan-i Hikmət"dən mühüm hesab etdiyimiz Hikmətlər seçilmiş və Türkiyə türkcəsinə tərcümə edilərək bir çox insanın oxuyub anlayaraq istifadə edə biləcəyi bir seçmələr məcmuəsi meydana gətirilmişdir. Bununla yanaşı, "Divan-i Hikmət", yüz illərlə ərəb hərfləri ilə yazılıb nəşr edildiyi üçün orjinal nüsxələrini göstərmək, bu xatirəni yad etmək və bir nostalgiyanı dövrümüzə sənətkaranə bir şəkildə çatdırmaq məqsədi ilə seçilən Hikmətlərin ərəb hərfləri ilə yazılışı, latın hərfləri ilə oxunuşu və sadələşdirilməsi birlikdə verilmişdir. Xoca Əhməd Yasəvinin həyatı və rəvayətləri ilə bağlı yeni çəkilmiş minyatürlər və bəzi şerlərin xəttatlıq sənəti ilə yazılmış lövhələri də əsərə sənət baxımından ayrı bir dəyər qatmışdır. Nəticədə, meydana çıxan bu gözəl sənət əsəri, Xoca Əhməd Yasəvinin həyatı, rəvayətləri və Yasəviyyə təriqətinin ədəbi haqqında bir giriş ilə birlikdə oxucularımıza təqdim edilmişdir.*

*"Divan-i Hikmət"dən seçmələr edilərkən əsərin ərəb hərfləri ilə çap edilən iki nəşrindən istifadə edilmişdir. Bunlardan birincisi, əsərin Qazan 1904-cü il nəşrinin Dayraybay Serıkbayulı və S. Rafiddinov tərəfindən ərəb hərfləri ilə və bilgisayarda yığılaraq 2001-ci ildə Almatıda çap edilən nüsxəsidir. İkincisi isə Kuanışbek Kari, Qaliya Qəmbərbekova və Rəsul İsmayılzadə tərəfindən həm ərəb hərfləri, həm də qazax dilinə uyğunlaşdırılması (tərcüməsi) ilə birlikdə hazırlanan və 2000-ci ildə Tehranda nəşr edilən nüsxəsidir. Bu ikinci nəşri hazırlayanlar "Divan-i Hikmət"in Qazan 1893 və İstanbul 1897-ci il nəşrlərini müqayisə edərək daha sağlam bir mətn tərtib etdikləri üçün seçmələrdə daha çox bu ikinci nüxəni əsas götürdük.*

*Seçilən Hikmətlərin Türkiyə türkcəsinə tərcüməsi/uyğunlaşdırılması Musa Uzunqaya tərəfindən edilmiş, professor Kamal Eraslan və doktor Hayati Bicə tərəfindən çap etdirilən nüsxələrdən də istifadə edilmişdir. Xətt və minyatürlər ilə həm elmi, həm də sənət əsəri olan bu işi həyata keçirən qrup olaraq, əsərin nəşrini öz üzərinə götürən Əhməd Yasəvi Universitetinə minnətdar olduğumuzu bildirmək istərdik.*

# *XOCA ƏHMƏD YASƏVİ*

Orta Asiyada İslamın yayılmağa başlaması ilə birlikdə Hicri II (miladi VIII) əsrdən etibarən bölgədə zahid və sufilər də görünməyə başlamışdır. Bü günkü Türkmənistan sərhəddləri daxilində olan Mərv şəhərində dünyaya gələn Abdulla ibn Mübarək (M. 181/797) həm hədis alimi, həm də zahid və sufi idi. Mərv şəhərində iki təkkə (ribat) qurduğu və buralarda xalqı maarifləndirdiyi qeyd olunur. Özbəkistan sərhəddləri daxilində olan Nahşəb (bü günkü adı Qarşı) və Tirmiz şəhərləri də bir çox alim və sufinin yetişdiyi bölgələr idi. "Sufini heç bir şey bulandıra bilməz, əksinə hər şey onunla saflaşır və durulaşır" deyən Əbu Türab Nahşəbi ilə (ölümü 245/859-860), vəlilik sahəsində fikirləri ilə tanınan və çoxlu sayda ərəbcə təsəvvüf əsərləri qələmə alan Hakim Tirmizi (ölümü 320/932-933) bu sufilərin ən məşhurlarındandır. Hakim Tirmizinin qəbri Tirmiz şəhərində indi də mühüm ziyarətgahdır.

Buxara və Səmərqənd isə həm alimləri, həm də sufiləri ilə Orta Asiyanın ən mühüm mədəniyyət mərkəzləri idi. Buxaranın

Kəlabaz (Kəlabad) Məhəlləsində yaşayan Əbu Bəkir Məhəmməd ibn İshaq Kəlabazi (ölümü 380/990) təsəvvüfün təlimlərini "Ət-Taarruf li Məzhəbi Əhlit-Təsəvvüf" adlı ərəbcə əsərində toplamış, həmçinin də "Bahrul-Fevaid" adlı əsərində bəzi hədislərə mistik şərhlər vermişdir.

Təkkə ədəbini müəyyən edən və tərtib etdiyi səma məclislərində oxuduğu eşq şerləri ilə tanınan Əbu Səid-i Əbül-Hayr (ölümü 440/1049), bu gün Türkmənistanda yerləşən Meyhənədə yaşamış və orada vəfat etmişdir. Türkmən xalqı arasında "Mənə Baba" ləqəbi ilə xatırlanır. Həyatı, rəvayətləri və sözləri Məhəmməd ibn Əbu Ravh Lütfullahın (ölümü 541/1147) "Halat u Sühanan"ı, Şeyx Əbu Said və Məhəmməd ibn Münəvvərin "Əsrarüt-Tevhid Fi Makamatiş-Şeyh Əbu Said" adlı farsca əsərləri ilə dövrümüzə gəlib çatmışdır. Mövlanə Cəlaləddin Rumiyə istinad edilən və "yenə gəl, yenə gəl, nə olursan ol, yenə gəl" deyə başlayan məşhur rübai də əslində Mövlanədən iki əsr öncə yaşayan Əbu Said-i Əbül-Hayrın şerləri arasındadır.

"Kəşfül-mahacub" adlı əsərin müəllifi Hücviri (ölüm 465/1072) Fərqanə bölgəsində bəzi mütəsəvvüflərlə qarşılaşdığını, buradakı xalqın şeyxlərə "Bab" dediyini nəql edir. Əslində bu hal Orta Asiyadakı digər bölgələrə də aiddir. Əhməd Yasəvinin bir müddət yanında təhsil aldığı Otırarlı Arslan Bab ilə Arslan Bab türbəsi daxilində qəbrləri olan Qarğa Bab və Laçın Bab da bu ünvanı daşıyırdılar. Nəsəbnamələrdə Əhməd Yasəvinin atası, babası və digər bəzi qohumlarının "Şeyx" kimi göstərilməsi, bu bölgədə Yasəvidən əvvəl də mistik hərəkatların mühüm dərəcədə güclü olduğundan xəbər verir. Bu şeyx və dərvişlərin köçəri və oturaq türklər arasında, xüsusilə Sırdərya sahillərində və bozqırlarda anlaşılan türk dili ilə xalqa xitab edərək İslamı və təsəvvüf əxlaqını yaydıqları aydın olur.

Orta Asiya ümumilikdə fütüvvət və məlamət vəsfi ilə önə çıxan Xorasan təsəvvüf mədəniyyətinin təsiri altında idi. Bununla yanaşı, Səmərqənd və Buxara kimi şəhərlərdə güclü mədrəsələri və alimləri olan bu mühit, Xorasanın qələndəri mənşəli sufilərinin yayılması üçün elə də əlverişli deyildi. Orada ancaq dini qaydalara qatı bağlı olan bir təsəvvüf anlayışı inkişaf edib yayıla bilərdi ki, nəticədə belə də oldu. Bağdad Nizamiyyə Mədrəsəsində təhsil alaraq müəllim olmuş, sonra Xorasan təsəvvüf mədəniyyətində yetişmiş bir sufi olan Yusif Həmədani, Maveraünnəhrdəki bəzi müridlərinə irşad icazəsi verərək xələfi kimi təyin etdiyi zaman Orta Asiyanın ən mühüm iki təsəvvüf məktəbinin də toxumlarını atmaqda idi.

Yusif Həmədaninin (ölümü 535/1140) iki önəmli müridi Xoca Əhməd Yasəvi və Əbdülxaliq Gücdüvani sonralar Orta Asiyanın ən geniş yayılmış təriqətləri olan Yasəviyyə və Xaceqan (sonrakı adı ilə Nəqşibəndiyyə) adlı təsəvvüf məktəblərinin qurucuları olmuşdur. Yusif Həmədaninin qələmə aldığı bəzi təsəvvüf əsərləri müasir dövrümüzə qədər gəlib çatmışdır. Bunlardan ən məşhuru "Rütbətül-Həyat" adlı farsca əsəridir. Yusif Həmədanidən dini və mistik təhsil aldıqdan sonra məmləkəti Yəsiyə qayıdaraq orada xalqı maarifləndirməyə başlayan Xoca Əhməd Yasəvi, Orta Asiyanın mənəvi həyatında dərin izlər buraxmış mühüm bir mütəsəvvüfdür.

## HƏYATI

Əhməd Yasəvi bu gün Qazaxıstanın Çimkənt şəhəri yaxınlarında olan Sayram qəsəbəsində dünyaya gəlmiş, dini, mistik təhsilini tamamladıqdan sonra yenə o bölgədəki Yəsi (bu günkü adı ilə Türküstan) şəhərinə yerləşmiş, uzun illər xalqı mənəviyyat yolunda maarifləndirdikdən sonra burada vəfat etmiş bir mütəsəvvüfdür. Atasi İbrahim Şeyx, Sayram və ətrafında müridləri olan tanınmış bir sufi idi. Ata və anasını kiçik yaşlarında itirən Əhməd Yasəvi, bir müddət Otırardakı Arslan Bab adlı şeyxin yanında dini-mistik təhsil aldı. Onun da vəfat etməsindən sonra başqa şəhərlərdə təhsilinə davam etdi.

O dövrün mühüm elm mərkəzlərindən Buxaraya gedən Əhməd Yasəvi burada Yusif Həmədani ilə tanış olaraq onun müridi oldu. Bəzi mənbələrdə Yasəvinin Şihabəddin Sührəverdinin (ölümü 632/1234) və ya Əbun-Nəcib Sührəverdinin (ölümü 563/1168-69) də müridi olub onlardan icazə aldığı qeyd edilir. Qohumları arasında başqa şeyxlər də olan və atasının Yəsidəki xələfi Musa Xoca ilə yaxınlığı Əhməd Yasəvinin bu qohumlarından da mühüm dərəcədə mistik təhsil aldığını ehtimal etməyə imkan verir.

Təhsilini bitirdikdən sonra Yəsidə dərgah qurub insanları dini və əxlaqi baxımdan yetişdirən Xoca Əhməd Yasəvi, mistik fikirlərini türk dilində və sadə şerlər vasitəsi ilə ifadə etmiş, hikmət adı verilən bu şerlər zaman keçdikcə toplanaraq “Divan-ı Hikmət” məcmuələri meydana gəlmişdir. Bəzi rəvayətlərdə ağacdan taxta qaşıq yonub sataraq keçimini təmin etdiyi qeyd edilsə də, əslində imkanlı bir ailəyə mənsub olduğu görünür. Haqqında nəql edilən rəvayətlərdən göründüyü kimi Yasəvi dərgahdakı zikr üsulu səbəbindən dövrünün bəzi alimləri tərəfindən tənqid edilmişdir. O da bəzi şerlərində səmimiyyətdən uzaq alimlər ilə saxta sufiləri tənqid etmişdir. Söhbətlərində və şerlərində ən çox işlədiyi mövzular Allah və peyğəmbər sevgisi, fəqir və yetimləri qorumaq, dini qaydalara əməl etmək, gözəl əxlaq, zikr, nəfs ilə mübarizə, özünütənqid (məlamət), ölümü düşünmək, mənəvi mərtəbələr və bu mərtəbələri aşmadan şeyxliyə iddia etmənin yalnışlığı kimi mövzular idi.

Rəvayətə görə Əhməd Yasəvi altmış üç yaşına gələndə dərgahında yerin altına kiçik bir otaq şəklində çiləxana düzəltdirir. Ömürünün qalan hissəsini əsasən orada ibadət və mütaliyə ilə keçirir. Sonrakı dövrlərə aid bəzi mənbələrdə Əhməd Yasəvinin hicri 562-ci ildə (miladi 1166-67) vəfat etdiyi qeyd edilsə də, bəzi tədqiqatçılar bu tarixin bir qədər sonraya təsadüf etdiyini düşünürlər.

Əhməd Yasəvinin İbrahim adında bir oğlu olsa da, özü həyatda olduğu zaman vəfat etmişdir. Yasəvinin nəsli Gövhər adlı qızı ilə davam etmişdir. Türküstan, Maveraünnəhr və Orta Asiyada olduğu kimi Anadoluda da özlərini Əhməd Yasəvinin nəslindən sayan bir çox məşhur şəxsiyyət çıxmışdır. Səmərqəndli Şeyx Zəkəriyyə, Skopyeli Şair Ata və Evliya Çələbi bu şəxsiyyətlərdən bəzíləridir.

XIV əsrin sonunda Əmir Teymur, Türküstan bozqırlarında şöhrəti və nüfuzu geniş yayılmış olan Əhməd Yasəvinin qəbrini ziyarət edərək, qəbrin üstünə bir türbə inşa edilməsini əmr etmiş, bir neçə il ərzində türbə, məscid və dərgahı ilə birlikdə bir kompleks formalaşmışdır. Bu gün bu türbə Orta Asiyanın ən mühüm ziyarət yerlərindən biridir. Əhməd Yasəvinin çiləxanası ilə türbəsi arasında yüz metrəlik məsafənin olması, onun ilk və əsil dərgahının çiləxana bölgəsində olduğunu düşünməyə əsas verir. Vəfatından sonra dəfn edildiyi yerə zaman keçdikcə böyük bir kompleks inşa edildikdən sonra kitabxana, aşevi, məscid və Dərviş hücrələrindən ibarət yeni və daha böyük bir dərgahın meydana gəldiyi ehtimal olunur.

Əhməd Yasəvinin Yəsidə maarifləndirmə işinə başladığı zaman Orta Asiyada islamlaşma ilə yanaşı, geniş yayılan təsəvvüf hərəkatları da vardı. Bu dövrdə Yasəvi, Daşkənd və Sırdəryadan o tərəfdəki bozqırlarda yaşayan köçəri türklər arasında böyük bir nüfuz qazanmışdır. İslamın əsaslarını, gözəl əxlaqı, təsəvvüfün ədəb və ərkanını bəsit və sadə bir dillə öyrədirdi. Buna görə xalq ədəbiyyatından alınan ifadə üsulları ilə hörülmüş heca vəznində mənzumələr söyləyirdi. Hikmət adı verilən bu mənzumələr, Dərvişləri vasitəsi ilə ən uzaq türk cəmiyyətlərinə qədər çatdırılırdı. Bunun sayəsində Yasəvilik, qısa müddətdə Orta Asiya türkləri arasında yayıldı.

Müridlərindən Sufi Məhəmməd Danışməndin qələmə aldığı "Miratül-Kulub" adlı əsərdə Əhməd Yasəvidən nəql edilən "Axırzamanda bizdən sonra elə şeyxlər zühur edəcək ki, şeytan onlardan dərs alacaq və onlar şeytanın işini görəcəklər... Əhli Sünnət vəl-camaatı düşmən görərək əhli bidət və dələləti sevəcəklər" şəklindəki sözləri ilə bəzi "Divan-ı Hikmət" nüsxələrində yer alan

"Mürşidlikni dava qılır şərtin bilməz
Halal-haram, sünnət, bidət fərqin bilməz
Bu-Hənifə məzhəbində hərgiz yürüməz
Digər bidət məzhəblərdin yürürlər-e"

kimi ifadələri, digər Orta Asiya türkləri kimi Əhməd Yasəvinin də Sünni və Hənəfi olduğunu göstərir.

Əhməd Yasəvinin sözlərini ehtiva edən ən qədim əsərlərdən biri Sufi Məhəmməd Danışməndin "Miratül-Kulub" adlı Cığatay türkcəsi ilə yazılmış əsəridir. Yasəvinin rəvayətlərini ehtiva edən ən qədim əsər də Hüsaməddin Sığnakiyə (ölümü 711/1311-1312) istinad edilən farsca "Menakıb" risaləsidir. Bu əsərlərin hər ikisi də nəşr edilmişdir. Əhməd Yasəvi, hikmətlərindəki düşüncələri və xüsusilə də ibrətamiz həyatı ilə Orta Asiya təsəvvüfünün ən böyük nümayəndələrindən biri olmuşdur.

## ƏSƏRLƏRİ

### *1. Divan-i Hikmət*

Yasəvinin türk dilində şerlərinin toplandığı kitabın adıdır. "Divan-i Hikmət" nüsxələri, məzmun baxımından olduğu qədər dil baxımından da bir-birindən mühüm fərqlərə malikdir. Bu hal, hikmətlərin müxtəlif şəxslər tərəfindən yazıldığını və ya toplandığını göstərir. Bir hissəsi itirilən və ya zaman keçdikcə dəyişikliyə məruz qalan hikmətlər toplanarkən yeni hikmətlər əlavə edilmiş, beləliklə əsas mətn qismən orjinalından uzaqlaşmışdır. Bununla yanaşı, bütün hikmətlərin təməlində Yasəvinin inanc və düşüncələri ilə təriqətinin əsasları dayanır. Hikmətlər, türklər arasında bir düşüncə birliyinin təşəkkül tapması baxımından çox əhəmiyyətlidir. "Divan-i Hikmət" köhnə və yeni hərflərlə bir neçə dəfə nəşr edilmişdir. Bu nəşrlərdən ən sonuncusu hikmətlərin Cığatay türkcəsi orjinalları ilə birlikdə Hayati Bicenin türkcə sadələşdirməsinin yer aldığı və Əhməd Yasəvi Universiteti Himayəçilik Şurası Sədrliyi tərəfindən nəşr ediləndir (Ankara 2016).

## *2. Fəqr-namə*

Yasəviyə istinad edilən və Cığatay türkcəsi ilə yazılmış "Fəqr-namə", "Divan-i Hikmət"in Daşkənd və bəzi Qazan nüsxələrində yer almışdır. Müstəqil bir risalədən daha çox "Divan-i Hikmət"in mənsur bir müqəddiməsi olan "Fəqr-namə", Kamal Erarslan tərəfindən 1977-ci ildə yeni hərflərə çevrilərək "İstanbul Universiteti Ədəbiyyat Fakültəsi Türk Dili və Ədəbiyyatı Jurnalı"nın 22-ci sayında (s.45-120) məqalə halında nəşr etdirilmişdir. Əhməd Yasəvi Universiteti Himayəçilik Şurası Sədrliyi tərəfindən bu məqalə müstəqil bir kitab kimi çap etdirilmişdir (Ankara, Aprel 2016).

## *3. Risalə dər Ədəb-i Təriqət*

Daşkənddə əlyazma nüsxələri tapılan bu kiçik farsca əsər, təriqət ədəbi və məqamları, mürid- mürşid münasibətləri, dərvişlik, Allahı tanımaq və ilahi eşq kimi mövzular haqqındadır. S.Mollaqanaqatuli tərəfindən qazax türkcəsinə tərcümə edilərək nəşr edilmişdir (Almatı 2012). Əsər Necdet Tosun tərəfindən farsca orjinalından türkcəyə tərcümə edilərək Əhməd Yasəvi Universiteti Himayəçilik Şurası Sədrliyi tərəfindən "Fəqr-namə" ilə birlikdə çap etdirilmişdir (Ankara, Noyabr 2016).

## *4. Risalə dər Məqamət-i Ərbain*

Yasəviyə istinad edilən farsca əlyazma və kiçik bir əsər olub, şəriət, təriqət, mərifət və həqiqətdən hər biri haqqında on məqam olmaqla cəmi qırx məqam və qaydanı özündə ehtiva edir. Hazırda bilinən yeganə nüsxəsi Kütahya Tavşanlı Zeytunoğlu Bölgə Xalq Kitabxanasındadır (nr 1056, vr.112a-113a). Əsər Necdet Tosun tərəfindən farsca əslindən türkcəyə tərcümə edilmiş və Əhməd Yasəvi Universiteti Himayəçilik Şurası Sədrliyi tərəfindən "Fəqr-namə" və "Risalə dər Ədəb-i Təriqət" ilə birlikdə çap etdirilmişdir (Ankara, Noyabr 2016).

## RƏVAYƏTLƏRİ

əhməd Yasəvinin həyatı haqqında qədim mənbələrdəki məlumatlar olduqca məhduddur. O, Türk Dünyasında, real həyatından daha çox rəvayətləri ilə tanınmışdır. Bu rəvayətlərin bir hissəsi onun real həyatı və düşüncələri haqqında məlumat versə də, digərləri xalq təxəyyülünün məhsuludur. Ona aid bir çox rəvayətdən bəziləri bunlardır:

Rəvayətə görə Arslan Bab əsabələrin öndə gələnlərindən idi. (Bab, şeyx deməkdir. Bu kəlimə sonralar bəzi əsərlərə Baba kimi daxil olmuşdur). Həzrəti Peyğəmbərin qəzalarından birində əsabələri ac qalaraq peyğəmbərin hüzuruna gəldilər və bir az ərzaq istədilər. Həzrəti Peyğəmbərin duasından sonra Cəbrayıl Əleyhsalam Cənnətdən bir tabaq xurma gətirdi. Lakin o xurmaların biri yerə düşdü. Cəbrayıl Əleyhsalam buyurdu: "Bu xurma sizin ümmətinizdən Əhməd Yasəvi adlı birinin qismətidir." Hər əmanətin sahibinə çatdırılması tələb olunduğu üçün Həzrəti Peyğəmbər, əshabələrindən birinə bu işi tapşırmaq istədi. Nəticədə xurmanı Arslan Babın ağzına atdı və çox sonralar

yaşayacaq Əhməd Yasəvinin tərbiyəsi ilə məşğul olmasını söylədi. Dörd yüz il yaşayan Arslan Bab, Sayrama və yaxud Yəsiyə gəldi və vəzifəsini yerinə yetirdi.

Bəzi soy şəcərələrində Arslan Bab, Əhməd Yasəvinin atası İbrahim Şeyxin qohumu kimi göstərilir. Böyük ehtimalla Arslan Babın məna aləmində (röyada) gördüyü bu xurma hadisəsi sözlü rəvayətlərdə dəyişmiş və hekayə bu şəkilə düşmüşdür.

Əhməd Yasəvi həzrətləri vaxtını üçə ayırırdı. Günün böyük bir hissəsində ibadət və zikrlə məşğul olurdu. İkinci hissəsində tələbələrinə zahiri və batını elmləri öyrədirdi. Üçüncü hissəsində isə alın təri ilə keçimini təmin etmək üçün taxtadan qaşıq və çömçə hazırlayaraq bunları satırdı. Bir rəvayətə görə onun bir öküzü var idi. Bu öküzün belinə bir heybə asar, içinə də hazırladığı qaşıq və çömçələri qoyub Yəsi bazarına gedərdi. Kim qaşıq və çomçədən alarsa, pulunu heybənin gözünə qoyardı. Malı alıb, pulunu verməyən olduğu halda, öküz o şəxsin arxasınca düşər, hara getsə, ardınca o da gedərdi. O şəxs pulu heybəyə qoyana qədər öküz onun yanından ayrılıb başqa yerə getməzdi. Axşam olduğunda da Əhməd Yasəvinin evinə gələrdi.

***

Xarəzmin Urgənc şəhərində İmam Mərvəzi (bəzi mənbələrdə Mərqazi və ya Məraqi) adında bir alim var idi. Ona Əhməd Yasəvi haqqında xoş olmayan sözlər gəlib çatmışdı. O, bu sözlərə inanaraq, onu imtahan etmək və şübhəsinə son qoymaq məqsədilə bəzi dostları ilə birlikdə yola çıxdı. Yasəvinin hər yerdə tələbələri olduğunu, hər zaman söhbətlərinə qulaq asmaq üçün minlərlə insanın gəldiyini öyrənmişdi. "Mən üç min məsələ əzbərlədim,

hamısını bir-bir soruşub onları imtahandan keçirərəm" deyə düşünürdü. Bu zaman Əhməd Yasəvi təkkəsində idi. Tələbəsi Sufi Məhəmməd Danışmənddən soruşdu: "Bir bax bizə kimlər gəlir?". Danışmənd Mərvəzinin yanındakılarla birlikdə və hafizəsində üç min məsələ ilə gəldiyini bildirdi. Yasəvinin əmri ilə Məhəmməd Danışmənd o üç min məsələdən minini Mərvəzinin hafizəsindən sildi. Sonra Yasəvi həzrətləri tələbələrindən Süleyman Hakim Ataya eyni qaydada əmr etdi. O da əmri yerinə yetirdi. Mərvəzi hafizəsində qalan min məsələ ilə Yəsiyə gəldi. Xoca Əhməd Yasəvinin yanına gələrək dedi: "Allahın qullarını doğru yoldan ayıran sənsən?". Yasəvi qətiyyən əsəbiləşmədi. Cavab da vermədi. "Hələlik üç gün qonağımız olun, sonra görüşərik" deyə buyurdu. Üç gün sonra bir kürsü quruldu. Mərvəzi danışmaq üçün kürsüyə çıxdı. Əhməd Yasəvi Hakim Ataya yerdə qalan min məsələni də silməsini söylədi. Hakim Ata, Allah-Təalaya dua etdi. Ağlındakı min məsələ də silindi. Mərvəzi kürsü üstündə nəsə demək istədi. Ancaq hafizəsində heç bir məsələnin olmadığını anladı. Dəftər-kitabını açaraq oradan oxumaq istədi. Ancaq dəftərindəki yazıların da silinmiş olduğunu gördü. Səhfələr bomboş idi. Bu vəziyyəti görən Mərvəzi səhvini anladı, tövbə etdi və Əhməd Yasəvinin müridi oldu. Onun yanında yüksək mərtəbələrə çatdı.

***

Yenə də bir rəvayətə görə Yəsi şəhərinə yaxın bir yerdə Savran adlanan bir qəsəbə var idi. Buranın əhalisinin əksəriyyəti qeyri-müsəlman idi, Müsəlman Yəsi əhalisinə və xüsusilə Əhməd Yasəvi həzrətlərinə qarşı qatı düşmənçilik edirdilər. Əhməd Yasəvinin böyüklüyü, kəramətləri ətrafa yayıldıqca və ona bağlı olanların sayı hər keçən gün artdıqca Savranlılar daha çox narahat

olur, Xoca həzrətlərinə olan düşmənçilikləri daha da artırdı. Bir gün Əhməd Yasəviyə iftira atmaq istədilər. Bir yerə toplaşdılar. Aralarından birinin öküzünü gətirib sallaqxanada kəsdilər və orada yalnız ayaqlarını saxladılar. Ertəsi gün də qazinin yanına gedib şikayət etdilər. Öküzlərinin oğurlanaraq sallaqxanada kəsildiyini, qanı axıdılaraq tələsik götürüldüyünü, qan izlərinin arxasınca düşdüklərini və öküzlərinin Əhməd Yasəvi təkkəsinə aparıldığını öyrəndiklərini bildirdilər. Qazi Əhməd Yasəvinin təkkəsinə girərək öküzlərini axtarmalarını söylədikdə təkkəyə gəldilər və birbaşa gecə gizlədikləri öküzün yanına getdilər. Elə məqsədlərinə çatdıqlarını düşünürdülər ki, Yasəvinin kəraməti sayəsində iftira edənlərin hamısı bir anda itə çevrildilər. Onlar öküzün ətinə hücum edərək onu tamamilə yeyib qurtardılar. Bununla da əsas xislətləri ortaya çıxdı. Çöldə gözləyərək bu dəhşətli mənzərəni seyr edənlər heyrət, dəhşət və qorxu içində Əhməd Yasəvinin ətəklərindən yapışdılar. Peşman olduqlarını bildirərək bağışlanmaları üçün yalvarmaya başladılar. Yasəvi həzrətləri mərhəmət edib dua etti. Bununla da təkrar əvvəlki vəziyyətlərinə qayıtdılar. Başqa bir rəvayətə görə bu Savranlılar Xoca Əhməd Yasəvinin oğlu İbrahimi öldürmüş və başını kəsib bir dəsmala bükərək Yasəviyə qovun adı ilə gətirmişdilər.

***

Başqa bir rəvayətə görə, Xoca Əhməd Yasəvi bir gün dərgahının qarşısında oturmuşdu. Bu zaman yoldan keçən bir qrup uşaq gördu. Məscidə və ya mədrəsəyə Quran öyrənmək üçün gedən bu uşaqlar müqəddəs kitablarını bir qılıfın içinə qoyaraq boyunlarından aşağı asdığı halda, aralarından biri Qurana olan hörmətindən irəli gələrək onu başının üzərində aparırdı. Həmçinin

mədrəsədən evinə qayıdarkən xocasının olduğu tərəfə arxasını çevirməmək üçün üzünü xocası olan tərəfə tutmaqla yürüyürdü. Bunu görən Əhməd Yasəvi o uşağa dedi: “Oğlum! Xocandan, ata və anandan icazə al, sənə dini təhsili mən verim.” Uşaq icazələri alaraq Yasəvinin dərgahına gəldi. Uzun illər dini əsərlər oxuyub elm aldı, sonra mürid olaraq mənəviyyatda irəlilədi. Bu uşağın adı Süleyman idi. Bir gün Əhməd Yasəvi Süleyman və digər bir neçə dostunu odun yığmaq üçün çölə göndərdi. Gətirilən odunlarla yemək bişiriləcək və Dərvişlər, tələbələr və qonaqlar qonaq ediləcəkdi. Uşaqlar odun gətirərkən yolda yağış yağmağa başladı. Süleyman paltosunu çıxarıb odunları bükdü. Dərgaha gəldikləri zaman digər uşaqların gətirdiyi yaş odunlar yanmadığı halda Süleymanın quru odunları yandı. Bunu görən Yasəvi dedi: “Sən incə düşüncəli, yəni hikmətli iş görmüsən. Bundan sonra sənin adın Hakim Süleyman olsun.” Sonrakı illərdə xocası Əhməd Yasəvidən icazə (diplom) alan və Bakırqan deyilən bölgədə yaşadığı üçün Süleyman Bakırqani adı ilə də tanınan bu şəxs, daha çox Hakim Ata adı ilə məşhur olmuşdur.

***

Əhməd Yasəvi, çox sevdiyi Həzrəti Peyğəmbərin 63 yaşında vəfat etdiyini düşünərək özü də bu yaşa gəldikdən sonra yer üzündə çox gəzmək istəməmişdir. Zamanının çox hissəsini dərgahındakı bir yeraltı otağı şəklində tərtib etdiyi çiləxanasında keçirirdi. Öndə gedən tələbələrinən Seyid Mənsur Ata bu çiləxanaya ilk dəfə endiyi zaman gördüyü mənzərəyə üzüldü. “Şeyxim bu dar yerdə sıxıntı içindədir” deyərək ağlamaya başladı. O halda gözündən pərdələr açıldı, o çox dar zənn etdiyi yeri bir ucu şərqdə, bir ucu qərbdə gördü və içindən keçirdiklərinin yalnış olduğunu anladı.

***

Bir gün Əhməd Yasəvinin dərgahında bir çox mürid toplaşmışdı. Ancaq bura dar bir yer olduğu üçün müridlər çox tərləmiş və tər ortaya saçılmışdı. Dərgahın alt hissəsinə bir küp qoyub ağzını açdılar. Sızan tər o küpə dolur və küpün içində gözəl bir şərbətə çevrilirdi. Sufilər də bu şərbətdən içirdilər. Sonradan bu küp "Eşq Küpü" (Hum-i Eşq) adı ilə məşhur oldu.

## TÜRBƏSİ

Xoca Əhməd Yasəvi, miladi təqvimlə 1166-cı ildə vəfat etdiyi zaman içində çiləxanasının da olduğu dərgahın 100 metr uzaqlığında dəfn edilmiş və sadə bir qəbir türbəsi tikilmişdi. Bu ilk türbə o ərazidə yaşayan Müsəlmanlar üçün qısa zamanda ziyarətgaha çevrilsə də, çox keçmədən (XIII əsrin əvvəllərində) ortaya çıxan Monqol istilası və bu istilanın dağıdıcı təsirləri bu bölgədə də özünü göstərdi. XIV əsrin sonlarında Qızılorda dövlətini ortadan qaldırıb bu bölgəni ələ keçirən Əmir Teymur, Monqol xanının qızı Tükel Xanımı özünə xanım olaraq seçib gəlin halayını qarşılamaq üçün yola çıxmış, yolda Yəsi şəhərinə gələrək Xoca Əhməd Yasəvinin qəbrini ziyarət etmişdi. Bu Yəsi ziyarəti zamanı Teymurun yuxusunda Əhməd Yasəvini gördüyü, ona zəfər müjdəsi verən Yasəviyə bir şükran borcu kimi kiçik türbənin yerinə böyük bir kompleks inşa edilməsini əmr etdiyi qeyd edilir. Kompleksin tikintisi o dövrün Türküstan bölgəsinin ən məşhur memarlarından olan Xoca Hüseyn Şiraziyə tapşırılır.

İkiqübbəli düzbucaqlı şəklində olan kompleksdə mərkəzi hissənin ortasında böyük bir qazan var. Yeddi metalın qarışığından

olan bu qazanın ətrafında bəzi dualar və qazan ustası haqqında məlumatlar var. Əvvəllər bu qazana yüngül şirini qatılmış su qoyularaq cümə namazlarından sonra ziyarətçilərə paylandığı və şəfalı olduğuna inanıldığı qeyd edilir. Bu qazan 1934-cü ildə Stalinin əmri ilə aparıldığı sərgidən geri qaytarılmayaraq Sankt-Peterburqdakı Leninqrad Hermitaj muzeyinə qoyulmuş, sonralar isə Qazaxıstan hökumətinin səyləri nəticəsində 1989-cu ildə yenidən türbədəki yerinə gətirilmişdir (Bax: Mətin Akar, *Tayqazan*, Əhməd Yasəvi Universiteti Yayınları, Ankara 2017). Üzərində böyük bir qübbə olan bu mərkəzi hissənin ətrafında mətbəx (halımxana), məscid, kitabxana, Dərviş otaqları (xəlvətxana), su quyusu otağı (quduqxana) kimi müxtəlif məqsədlər üçün nəzərdə tutulmuş bir çox bölmələr var.

Mərkəzi hissəyə bitişik Orta Asiya mədəniyyətində övliya türbələrinin simvolu olan bir tuğ (ucunda at quyruğu qılları, bayraq və ələm olan bir dirək) və bir qapı yerləşir. Bu qapı Əhməd Yasəvinin məzarının olduğu otağa (Gurxana) açılır. Taxtadan oyma məhsul olan qapının iç tərəfindəki tökmə halqalardan birində hazırlanma tarixi hicri 797-ci il (miladi 1395) göstərilmişdir. Bu məzar otağının üzərində kiçik qübbə var. Yasəvinin məzarı üstü açıq yaşıl rəngli bir daşdan hazırlanmışdır. Mərkəzi hissənin yanlarındakı otaqlardan bəzilərində başqa məzarlar da mövcuddur. XVI əsrdən etibarən Qazax türklərindən bəzi nüfuzlu insanlar və rəhbərlər burada dəfn edilmişdir.

Kompleksin ətrafı və üzəri çinilərlə süsləndiyi halda, giriş qapısının olduğu cəbhə çinisizdir. Bu vəziyyəti, Teymurun vəfatından sonra kompleksin inşaatının başa çatdırıla bilmədiyi və çini süsləmələrin qismən az olması ilə izah edirlər. Hətta əsas girişin üstündəki kəmər hissəsinin də Teymurun vəfatı səbəbindən

tamamlanmadığı və hicri 1000-ci ildə (miladi 1591-92) Buxara əmiri Abdulla Xanın əmri və dəstəyi ilə bu kəmərin çəkildiyi qeyd edilir. Abdulla Xan dövründə qurulan iskələdən qalan taxtaların bir hissəsi müasir dövrümüzə qədər gəlib çatmışdır.

Türbənin çöl tərəfini əhatələyən üç cəbhəsində üst kənarı müşayət edən qurşaq formasında çinilərlə süslənmiş Quran ayətləri vardır. Bunlar Ənam surəsinin 59-63-cü ayətləridir. Bundan başqa cəbhədə çinilərlə və Kufi xəttlə Allah, Məhəmməd, əl-Həmdü lillah, Allahu Əkbər, La ilahə illallah kimi yazılar işlənmişdir. Türbənin kənarında giriş qapısına baxan baxçadakı kiçik türbə Uluğ Bəyin qızı və Əbul-Hayr Xanın xanımı olan Rabiə Sultanın türbəsidir.

## YASƏVİLİK

Əhməd Yasəvidən sonra müridləri vasitəsi ilə onun təsəvvüf yolu və düşüncələri zaman keçdikcə Orta Asiyanın müxtəlif bölgələrinə yayılmışdır. Bu yolun davamçılarının mənsub olduğu təriqətə Yasəviyyə, yüksək səslə zikr etdikləri (cəhri zikir) səbəbindən Cəhriyyə və mənsublarının əksəriyyətinin Türk olmasına görə Silsileyi Meşayihi Türk də deyilmişdir. Əhməd Yasəvinin ən məşhur xələfləri Mənsur Ata, Səid Ata, Sufi Məhəmməd Danışmənd və Hakim Atadır. Yasəvilik daha çox Hakim Ata və tələbələri vasitəsi ilə davam etmişdir.

Əsl adı Süleyman Bakırqani olan Hakim Ata (ölümü 582/1186) təsəvvüf təhsilini tamamladıqdan sonra Yəsidən ayrılıb Xarəzm bölgəsinə getmiş və orada xalqı irşada çağırmaqla məşğul olmuşdur. Xocası Əhməd Yasəvi kimi hikmət tərzində türkcə şerlər söyləyən Hakim Atanın bəzi şerləri "Bakırqan Kitabı" adlı məcmuə şəklində müasir dövrümüzə gəlib çatmışdır. "Axır Zaman Kitabı", "Həzrəti Məryəm Kitabı" və "Miracnamə" kimi digər mənzum əsərləri də olan Hakim Atanın həyatı və rəvayətləri,

müəllifi məlum olmayan türkcə və mənsur "Hakim Ata Kitab"ında toplanmışdır. "Barça (hər kəs) yaxşı biz yaman, barça buğda biz saman" və "hər gördüyünü Xızır bil, hər gecəni Qadir bil" kimi sözləri ilə məşhurdur. Məzarı Özbəkistanın Qaraqalpaq Muxtar Respublikasındakı Konqrat şəhərindədir.

Hakim Atanın ən mühüm xələfi Zəngi Atadır (ölümü 656/1258). Daşkənddə yaşayan Zəngi Atanın çobanlıq edərək keçimini təmin etdiyi və şeyxi Hakim Atanın vəfatından sonra dul qalan xanımı Ənbər Ana ilə evləndiyi rəvayət edilir. Zəngi Atanın məşhur dörd xələfi Uzun Həsən Ata, Seyid Ata, Sədr Ata və Bədr Atadır. Bunlardan Seyid Ata və Sədr Atanın Dəşti Qıpçaqdakı Saraycığa getdiyi, oradakı Qızılorda hökümdarı Özbək Xanı İslama dəvət etdiyi və Sədr Atanın göstərdiyi kəramət nəticəsində Özbək Xan ilə birlikdə 70000 insanın müsəlman olduğu rəvayət edilir.

Əhməd Yasəvinin digər bir icazə verdiyi müridi (xələfi) Sufi Məhəmməd Danışmənd Otırarda dərgah qurub xalqı irşada dəvət etmişdir. Danışməndin ən məşhur tələbəsi Süzük Ata (bəzi mənbələrdə ləqəbi Sükçük və ya Süksük kimi qeyd edilir) kimi tanınan Şeyx Mustafadır. Şeyx Mustafanın xələfi İbrahim Ata, İbrahim Atanın oğlu İsmayıl Atadır. Atası öldüyü zaman on yaşında olan İsmayıl Ata din və təsəvvüf təhsilinə Xarəzm, Buxara və Səmərqənddə davam etdikdən sonra Xocəndə gedərək Şeyx Məsləhət Xocəndidən xələflik almış və məmləkəti Qazıqurdda əhalini irşada çağırmağa başlamışdır. Oğlu və xələfi Xoca İshaq XIV əsrin ortalarında qələmə aldığı "Hadiqaul-Arifin" adlı türk dilində yazılmış əsərində atası İsmayıl Ata və digər bəzi sufilərin fikirləri ilə Yasəvilik ədəbinə yer vermişdir. İsmayıl Ata və oğlu Xoca İshaqın qəbirləri Qazıqurd yaxınlığındakı Turbatdadır. Yuxarıda adı çəkilən Süzük Atanın Tarazda məmur olan "Məliküz-

zühhad" ləqəbli bir şəxsə xələflik verdiyi, bu silsilənin Əbun-Bur Süleyman Aşiq ibn Davud və Cəmaləddin Məhəmməd Qaşqari ilə davam etdiyi üzə çıxır.

Yuxarıda adı çəkilən Zəngi Atanın mürid və xələflərindən Sədr Atadan sonra ardıcıl olaraq Ələmin Baba (bəzi mənbələrdə Əymən və ya Almın), Şeyx Əli Şeyx və Mevdud Şeyx xalqı irşada dəvət etməyə davam etmişlər. Mevdud Şeyxdən sonra Yasəviyyə silsiləsi iki qola ayrlılaraq davam edir: Bunlardan biri Kamal Şeyx İkani, digəri Xədim Şeyx ilə başlayır. Kamal Şeyxdən sonra silsilənin bu qolu belə davam edir: Şeyx Əliabadi (Seyid Əhməd), Şəmsəddin Özgəndi, Abdal Şeyx (Şeyx Üveys), Şeyx Əbdülvasi və Şeyx Əbdülmüheym. Bu sonuncunun XVI əsrdə Daşkənddə yaşadığı bilinir. Bu silsilədəki Şəmsəddin Özgəndi "Şəmsi Asi" təxəllüsü ilə hikmət tərzində şerlər söyləmişdir.

Xədim Şeyx ilə başlayan digər Yasəvi qolu da öz daxilində iki qola ayrılaraq davam etmişdir: Birinci qol Xədim Şeyxin xələflərindən Şeyx Cəmaləddin Qaşqari Buxari, Süleyman Qəznəvi, Seyid Mənsur Bəlxi (ölümü 965/1557) ilə davam edərək Osmanlı dövründə İstanbulu ziyarət edən Nəqşibəndi və Yasəvi şeyxi Əhməd ibn Mahmud Xəziniyə qədər gəlib çıxır. Xəzininin əsərləri bunlardır: "Cəvahirül-Əbrar Min Əmvacil-Bihar", "Mənbaül-Əbhar Fi Riyazil-Əbrar", "Hüccətül-Əbrar", "Təsəllaül-Kulub", "Camiul-Mürşidin" və "Divan". Bu qoldakı Cəmaləddin Qaşqari Buxaridən sonra başqa bir alt qol Şeyx Xudaydad Buxari Qazireqi (ölümü 939/1532), Mövlanə Vəli Kuhi Zəri, Qasım Şeyx Əzizan Kərmineqi (ölümü 986/1578-79) və Pirim Şeyx yolu ilə davam edərək Alim Şeyx ləqəbli Məhəmməd Alim Siddiqiyə (ölümü 1043/1633) qədər gəlib çatır. Bu sonuncu şəxs 1033-cü ildə (1624) tamamladığı "Ləməhat Min Nəfəhatil-Quds" adlı Farsca əsərində

Əhməd Yasəvidən başlayaraq öz dövrünə qədər yaşamış bir çox Yasəvi şeyxi haqqında önəmli məlumatlar vermişdir. Alim Şeyxin xələfi olan Mövlanə Osmanın xələfi Buxaralı Mövlanə Məhəmmədi İmla (ölümü 1162/1749-1750) Yasəviliklə yanaşı Nəqşibəndiyyədən də icazə (bir növ diplom) almışdır.

Alim Şeyxin xələflərindən Məhəmməd Şərif Buxari (ölümü 1109/1697) fars dilində qələmə aldığı "Höccətüz-Zakirin Li Rəddil-Münkirin" adlı əsərində həm yüksək səslə zikrin doğru olduğunu isbat etmək üçün dəlillər gətirmiş, həm də əvvəlki Yasəvi şeyxləri haqqında məlumat vermişdir. Bu şəxsin Yasəviliklə yanaşı Nəqşibəndilikdən də icazəsi olmuşdur. Hikmət tərzində türk dilində şerlər yazan Qul Şərifin də bu şəxs olduğu ehtimal edilir. Özündən sonra silsilə ardıcıllığı ilə Fətulla Əzizan və Lütfulla Əzizan ilə davam edərək Şeyx Xudaydad ibn Daş Məhəmməd Buxariyə (ölümü 1216/1801) gəlib çatır. Təsəvvüfə aid bir çox əsər qələmə alan Şeyx Xudaydadın "Bustanül-Muhibbin" adlı türk dilində əsəri Yasəviyyə təriqətinin ədəbi haqqında mühüm məlumatlara malik və yüksək səslə zikrin əhəmiyyətini izah edən bir mənbədir. Onun xələfi Ömər İşan, Yasəviliklə yanaşı Nəqşibəndiliyin Mucəddidiyyə qoluna da bağlı idi. XIX əsrin əvvəllərinə qədər izləri görünən və zəifləmiş ya da ki Nəqşibəndiliyin içində əriməyə başlamış olsa da silsiləsi bilinən Yasəvilik, bu tarixdən sonra yazılı mənbələrdən kənarda qalmış, XIX əsrin sonlarında rusların Orta Asiyada hakimiyyət qurmasından sonra isə gözdən itmişdir.

Yuxarıda qeyd edilən Yasəvi şeyxlərindən başqa mənbələrdə həyatı və ya silsiləsi haqqında yetərli məlumat olmayan başqa Yasəviyyə mənsubları da vardır. Əhməd Yasəvinin xələflərindən Baba Maçin və Yaşlıq Yunus Ata, İsmayıl Atanın müridi Otlug Yunus Ata, Bahəddin Nəqşibəndin görüşdüyü Qusəm Şeyx, Xəlil Ata və

Pəhlivan Ata, Əmir Külalın oğlu ilə görüşən Kök Ata, Türküstanlı Tonquz Şeyx, yalnız türk dilində danışdığı üçün Türkçü Ata kimi tanınan Daşkəndli bir Yasəvi şeyxi bunlardan bəziləridir.

Yaşayan bir şeyxdən təsəvvüf təhsili almayıb, röyasında Əhməd Yasəvidən, ya da sonrakı Yasəvi şeyxlərindən Üveysi yolu ilə xələflik aldığını söyləyən şəxslər də olmuşdur. XV əsrdə Şəhrisəbz yaxınlarında yaşayan və Həzrət Bəşir kimi tanınan Seyid Əhməd Bəşiri (ölümü 868/1463) ilə XVI əsrdə Şərqi Türküstanda yaşayan və Yarkənddə vəfat edən Məhəmməd Şərif Buzurqvar (ölümü 963/1556-57) bunlardandır. Seyid Əhməd Bəşirinin həyatı və rəvayətləri Nəsir ibn Qasım Türküstaninin "Həşt Hadiqa" və ya "Hadiqul-Cinan" adı ilə tanınan fars dilində əsərində toplanmışdır. Məhəmməd Şərif Buzurqvarın rəvayətləri isə Məhəmməd Siddiq Zəlilinin türk dilində və mənzum olan "Təzkireyi Məhəmməd Şərif Buzurqvar" adlı əsəri ilə eyni adı daşıyan, ancaq müəllifi bəlli olmayan mənsur türk dilində bir əsərdə toplanmışdır.

Bəzi mənbələrdə Tatar və Bulqar bölgələrində yaşayan Biraş ibn Abraş Sufi, Ufa yaxınlarında qəbri olan Hüseyn Beq, Azərbaycanın Niyazabad şəhərində türbəsi olan Əfşar Baba və Türkmənistanda yaşamış Gözlü Ata kimi şəxslərin Yasəvi şeyxi ya da dərvişi olduğu iddia edilir.

XV əsrin sonlarında qələmə alındığı ehtimal edilən Vilayətnamədə Anadolu sufilərindən Hacı Bektaşı Vəli birbaşa və ya dolayı olaraq Əhməd Yasəvinin xələfi kimi göstərilsə də, bu əsərdən daha əvvəl XIV əsrdə yazılan Əflakinin "Mənakibül-Arifin"ində və XV əsərdə qələmə alınan Aşıqpaşazadə Tarixində Hacı Bektaşı Vəlinin Vəfaiyyə təriqəti şeyxi Baba Rəsul ləqəbli Baba İlyasi Xorasaninin xələfi olduğu açıq şəkildə qeyd edilmişdir. Bundan başqa XVII əsrdə qələmə alınan Övliya Çələbi

Səyahətnaməsində Yasəvi Dərvişi kimi təqdim edilən Geyikli Baba və Əmirci Sultanın (Əmiri Çin Osman) daha qədim və etibarlı mənbələr olan Əlvan Çələbinin "Mənakibül-Qudsiyyə"si ilə Aşıqpaşazadə Tarixində Vəfaiyyə şeyxi Baba İlyasın öndə gələn xələflərindən olduğu göstərilir. Sonrakı dövrlərə aid və etibarllılığı mübahisəli olan "Vilayətnamə" və "Səyahətnamə" kimi bəzi mənbələrdə Anadoludakı bir qisim Vəfaiyyə mənsublarının Yasəviyyə təriqətindən olmalarının göstərilməsi, XIII əsrdə Vəfaiyyə şeyxlərindən Baba İlyası Xorasaninin Anadolu Səlcuqlu Dövləti əleyhinə başlatdığı üsyanın yaratdığı sosial psixologiya ilə birbaşa bağlı ola bilər. Babailər Üsyanı adı verilən bu hərəkat dövlət tərəfindən yatırıldıqdan sonra Vəfaiyyə təriqətinə mənsub olan, xüsusilə də Babailər ilə əlaqədar bir çox sufi, üsyan töhmətindən uzaq qalmaq üçün təriqətinin adını gizlətmiş, ya da Əhməd Yasəvi yolundan gəldiyini irəli sürmüş ola bilər. Sonrakı əsrlərdə bu söyləntilər "Vilayətnamə" və "Səyahətnamə" kimi kitablarda da əksini tapmışdır. Bu səbəbdən etibarlı mənbələr və orjinal silsilənamələr tapılmadığı müddətcə Anadolu və Balkanlarda Yasəvi varlığından danışmaq olduqca çətindir. XIX əsrin sonlarında Orta Asiyanın Fərqanə Vadisində və Qırğız bölgələrində ortaya çıxan Laçilər ilə Saçlı İşanların da Yasəviliklə əlaqəsi sübut edilməmişdir. Bunlar böyük ehtimalla Orta Asiya Qələndərilərinin son qalıqlarıdır.

# YASƏVİLİKDƏ TƏSƏVVÜF TƏLİMİ

## *İntisab*

İntisab, təsəvvüf yoluna girmək və bağlanmaq deməkdir. Yasəvilikdə təsəvvüf təlimi intisabla başlayır. Xoca İshaq ibn İsmayıl Atanın XIV əsrdə Cığatay türkçəsi ilə yazdığı "Hadiqatül-Arifin" adlı əsərində qeyd etdiyinə görə Yasəvilikdə intisap mərasimi belə keçirilirdi: Şeyx mürid olmaq niyəti ilə gələn şəxsin əlini tutur, tövbə etməsini və Allaha yönəlməsini tövsiyə edərək bu tövbə zikrini (vird) üç dəfə çəkirdi: "Əstağfirullahəlləzi la ilahə illa Hu əl-Hayyəl-Qayyum və əsəlühüt-tövbə". Sonra əlinə bir qayçı alır və "Ya əyyühəlləzinə amənu tubu ilallahi tövbətən nasuha" (ət-Tahrim, 66/8) ayəsini oxuyaraq müridin başından əvvəlcə sağ, sonra sol, sonra da orta tərəfdən iki-üç dəfə saç kəsirdi. Bu saç kəsmə hadisəsi simvolik olaraq müridin dünya və dünyəvi şeylərin sevgisini qəlbindən  kəsib atması

və mənəviyyata yönəlməsinin zəruriliyini ifadə edirdi. Bundan sonra şeyx, müridə Nafilə namaz qılmağı, daim zikr etməyi, şeyxindən icazəsiz iş görməməyi tövsiyə edərdi.

### *Zikr*

Yasəvilikdə birgə və yüksək səslə edilən zikrə zikri ərrə adı verilirdi. Zikri ərrə, fars dilində "mişar zikri" deməkdir. Zikrin növbəti mərhələlərində kəlimələr itir, yalnız boğazdan mişar səsinə oxşayan bir xırıltı çıxdığı üçün belə adlandırılmışdır. XIII əsrin sonları ilə XIV əsrin əvvəllərində yaşadığı bilinən Yasəvi şeyxi İsmayıl Atanın zikrlə bağlı bunları dediyi nəql edilir: "Dəmirçi dəmiri odda qızdırıb çəkiclə döydüyü kimi, mürid də qəbini Hu zikrinin çəkici ilə döyüb təmizləməlidir." İsmayıl Ata bir müridinə zikr təlqin etdikdən sonra belə deyərdi: "Ey Dərviş! Təriqət qardaşı olduq. Məndən bir nəsihət qəbul et: Bu dünyanı yaşıl bir qübbə kimi düşün, fərz et ki, aləmdə sadəcə sən varsan, bir də Haqq Təala var. O qədər zikr et ki, tövhidin qələbəsi ilə yalnız Haqq Təala qalsın, sən aradan çıx!" Xoca İshaq ibn İsmayıl Ata, hər şeyxin və mürşidin zikr üçün Allahın adlarından birini seçdiyini, Xoca Əhməd Yasəvinin "Allah" və "Hu" şəkilində iki adı müridlərə təlqin etdiyini, İsmayıl Atanın isə "Hu" zikrini seçdiyini söyləyir.

Müəllifi bəlli olmayan və "Risaləyi Zikri Həzrəti Sultanül-Arifin" adı ilə tanınan Cığatay türkcəsi ilə yazılmış bir əsərdə isə Yasəvinin zikrinin altı növündən bəhs edilir: 1. İsmi zat zikri: "Allah" deyə zikr etməkdir. Bu zikr, "Allah Hu, Allah Hu, Ya Hu, Allah Hu" şəklində icra edilir. 2. İsmi sifət zikri: "Hay ah, Hay

ah" deyə zikr etməkdir. Bu zikr günorta namazınndan sonra ayaqda (qiyam) icra edilir, "Hay" və "ah" deyəndə beş barmaq yumulur. 3. Düsərə zikri: "Hay, ah, Allah, Hay, Hu" və "Hay, Hayyen, Hu Allah; Hay, Hayyen, Hu Allah" deyə zikr edilir. 4. Zikri Hu: "Hu, Hu, Hu Allah; Hu, Hu, Hu, Allah" deyə zikr edilir. 5. Zikri çayqun: Zikr vaxtında ritm, ahəng və musiqinin birlikdə və ahəngdarlıqla davam etməsi üçün zakirin əlində cınqıraq kimi bir aləti hərəkət etdirməsi, "çak", "çak" deyə səs çıxarmasıdır. "Hu (çak), Hu (çak)" diyərək zikr edilir. 6.Çehar darb: "Hay, ah ah ah, Hay, Hu; Hay, ah ah, ah, Hay, Hu" diyə zikr edilir. Bu altı zikr üsuluna əlavə olaraq bir də "zikri kəbutər" (göyərçin zikri) var ki, o da "Hu, Hu" deyə icra edilir.

## *Xəlvət*

Dərvişlərin ibadət və təfəkkür üçün bir müddət yalnız qalmalarına xəlvət deyilir. Yasəvilikdə təsəvvüf təliminin mühüm elementlərindən biri də xəlvətdir. Yasəviyyə təriqətində xəlvətin ənənəvi bir ədəb və mərasimi vardır. Xəzininin "Cəvahirül-Əbrar"da verdiyi məlumata görə, ümumi qəbul edilən yanaşmadan fərqli olaraq Yasəviyyədə xəlvət qrup formasında həyata keçirilir. Xəlvətə girəcək müridlər, mürşidin razılığı ilə bir gün əvvəldən oruc tutmağa başlayırlar. Xəlvəttən bir gün əvvəl sübh namazından sonra müridlər zikr və təkbirlərini artırırlar. Eyni gün ikindi namazından sonra xəlvətxananın qapı, baca, bütün dəlikləri bağlanır və müridlər günəş batana qədər tövbə və zikrlə məşğul olurlar. Axşam namazından sonra iftar üçün isti

su gətirilir, müridlər bununla orucunu açır və bundan sonra su verilmir. Sonra qara darıdan xəlvət şorbası verilir. Bütün xəlvət əhli bu şorbanı içdikdən sonra hərarəti azaltmaq üçün kiçik bir qarpız ya da ayran verilə bilər. Yeməkdən sonra Qurani Kərimdən bir surə, ya da bir neçə ayə oxunur. Ayaqda səf tutub üç dəfə təkbir gətirilir, sonra oturulub gecə yarısına qədər zikrulla ilə məşğul olunur. Bu əsnada "hikmət" adı verilən ilahilər oxunur. Sonra saçlar kəsilir və xəlvətxananın dörd tərəfinə doğru təkbir gətirilir. Bundan sonra zikrlə məşğul olunur. Şam sönənə qədər bir neçə saat istirahət edilir və görülən yuxular şeyxə yozdurulur.

Xəlvət, gecə-gündüz bu şəkildə qırx gün davam edir. Qırx günün sonunda mətbəxdə çalışanlar digərlərindən əvvəl xəlvətxanadan çıxır və qurban kəsirlər.

Bu qurbanların qanlarını və sümüklərini gömərək gizləmək adət halını almışdır. Kəsilən qurbanların boğazları kabab edilərək soyuq su və ya ayranla xəlvət əhlinə verilir. O gecə sufilər evlərində istirahət edir və ertəsi gün sübh namazında dua və zikrlərlə xəlvətin tamamlandığı elan edilir.

## *Söhbət*

Bəzi Yasəvi şeyxləri təsəvvüfi və əxlaqi söhbətin əhəmiyyətini vurğulamaq məqsədilə "Namazın qəzası olar, amma söhbətin qəzası olmaz" demişlər. Qafil insanların, hətta bu qafil insanlara aid əşyaların belə sufilərin mənəvi rahatlıq halını pozacağına inanırdılar. Rəvayətə görə, Xoca Əhməd Yasəvi

söhbətində gözlənilən feyz və rahatlıq halı ortaya çıxmayanda müridlərinə təkkəni araşdırmalarını söyləmiş, qafil bir şəxsin çəliyini təkkədə unutduğunu görmüş, yalnız bu çəlik çölə çıxarıldıqdan sonra feyzli söhbət edə bilmişdir.

### *Xələflik*

Təsəvvüf təlimini tamamlayan Dərviş, xalqı irşada yönəltmə səlahiyyəti, yəni xələflik (icazə) alır və xələf olurdu. Yasəvilikdə icazə və xələfliyin simvolu kimi bu şəxsə şeyx tərəfindən bir əsa hədiyyə edilirdi. Çobanın qoyunları əsa ilə otardığı və qurdlardan qoruduğu kimi, xələf olan şəxsin də mənəvi tərbiyəsi ilə məşğul olduğu şəxsləri təlimdən keçirməsi və nəfsin tələlərindən qoruması nəzərədə tutulurdu. Təsəvvüfi təlim mərtəbələrini tamamlamayan müridə xələflik verilməsi qəbul edilməzdi. Bu mərtəbələri aşdıqdan sonra da daxilində təkəbbür hissinin qalıb-qalmadığını anlamaq üçün bəzən boynuna bir səbət asılır və bir müddət dilənçilik etməsi tələb edilirdi. Xələflik əsası alan şəxsin yüksək əxlaqa sahib olması və Yasəviliyin piri Xoca Əhməd Yasəvini duada unutmaması tələb olunurdu.

### *Xidmət*

Xoca İshaq ibn İsmayıl Atanın qələmə aldığı “Hadiqatül-Arifin”in üçüncü bölməsi şeyx və şeyxlik haqqındadır. Bu bölmədə “şeyxlik, xalqı Haqqa dəvət etməkdir”, “bütün insanlara qarşı şəfqətli olmaqdır” kimi ifadələr işlədilir. İsmayıl Atadan

soruşurlar: "Xalqı Haqq Təalaya çatdıran neçə yol var?" Belə cavab verir: "Varlıqdakı bütün zərrələrin sayı qədər yol vardır. Amma bir müsəlmanı rahatlatmaq və ona faydalı olmaqdan daha yaxın və daha yaxşı bir yol yoxdur."

Nəticə etibarilə, Xoca Əhməd Yasəvi, şerləri, fikirləri və əsərləri ilə Orta Asiyada İslamın əxlaq və mənəviyyatının yayılmasında mühüm xidmətləri olmuş bir Allah dostudur. Hikmət tərzində olan şerləri qısa zamanda Anadoluya qədər gəlib çatmışdır ki, Yunis Əmrənin "Mənə səni gərək səni" nəqarətli şeri də, Yasəvinin "Məngə sən ok gərək sən" (Mənə sırf sən gərəksən) şerinin məna və forma baxımdan bir növ təkrarı kimidir. Osmanlıda xüsusilə Nəqşibəndilərə aid özbək təkkələrində "Divan-i Hikmət"dən bəzi şerlərin ilahi tərzində oxunduğu bilinir. Osmanlı son dövründə Nəqşibəndi-Xalidi şeyxlərindən Hacı Həsən Şükrü Əfəndi (ölümü 1327/1909) tərəfindən bəzi hikmətlər Cığatay türkcəsindən Osmanlı türkcəsinə çevrilmiş və "Tərcümeyi Divani Əhmədi Yasəvi" adı ilə nəşr edilmişdir (İstanbul 1327/1909). Bu vəziyyət Əhməd Yasəvinin Orta Asiyadan minlərlə kilometr uzaqlarda belə əsrlərlə unudulmadığını və fikirlərindən istifadə edildiyini göstərir.

Yasəvinin hikmət tərzində şerləri əsrlərdən bəri Qazax bozqırlarında əks-səda tapdığı kimi, Özbək kəndlərində və Qırğız çadrlarında da təkrarlanmışdır. Özbəklər çayxanalarında Yasəvi hikmətləri oxuyanlara "Yasəvixan" adını vermişlər, bu hikmətlər xüsusilə Fərqanə vadisində qadınlar arasında da oxunmuşdur.

Qırğızların "Divan-i Hikmət"i və Hakim Atanın şerlərini özündə ehtiva edən "Bakırqan Kitabı"nı uşaqlarına oxuduqları bilinir. Axirətdə Sırat Körpüsündə Əhməd Yasəvinin Qırğızlara yardım edəcəyi şəklində xalq inancı da Yasəviliyin Qırğızlar üzərindəki təsirini göstərir. Bu gün Qazaxıstanın Türküstan (qədim adı Yəsi) şəhərində toy edən bəy və gəlinlərin Əhməd Yasəvi türbəsinə gələrək dua etmələri belə bu böyük könül insanının əsrləri aşan təsirinin bir göstəricisidir.

